UOT: 619:616.17.9

# İRİBUYNUZLU HEYVANLARDA MƏDƏ ÖNLÜKLƏRİNİN XƏSTƏLİKLƏRİ

**Ə.T MƏMMƏDLİ, Y.T.BAĞIROV, R.C.MƏMMƏDOV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Məqalədə iribuynuzlu heyvanlar arasında çox geniş yayılmış və məhsuldarlığa ciddi ziyan vuran mədə önlükləri xəstəlikləri şərh olunmuşdur.*

*Hazırda kəndli fermer təsərrüfatlarında iribuynuzlu heyvanlar arasında mədə önlüklərinin xəstəliklərinə çox tez- tez rast gəlmək olur. Odur ki, müassir heyvandarlıqda bu xəstəliklərin müalicə-profilaktikasına xüsusi diqqət verilməlidir. Bizim müşahidələrimizə və statistik məlumatlara əsasən aşağıdakı mədə önlüklərinin xəstəliklərinə heyvandarlıq təsərrüfatlarında daha çox təsadüf olunur. Bu baxımdan məqalədə həmin xəstəliklərin müalicə-profilaktikası qeyd edilmişdir.*

***Açar sözlər:*** *müalicə, profilaktika, işgənbə, torcuq, kitabça.*

**Mədə önlüklərinin atoniyası.** Xəstəliyin baş verməsi əsasən mədə-önlüklərinin mator funksiyasının pozulması ilə xarakterizə olunur. Heyvanların aşağı keyfiyyətli yem rasionu ilə uzun müddət yemləndirdikdə bu xəstəlik əmələ gəlir. Məsələn, heyvanlar daima quru saman, xırdalanmış küləş, gec biçilmiş otla (vaxtı keçmiş), qələviliyi çox olan yemlərlə, keyfiyyəti aşağı olan silosla və eləcə də bir tərəfli qüvvəli yemlərlə yemləndirildikdə atoniya xəstəliyi olur. Bundan əlavə heyvanlar uzun müddət fəal gəzintiyə buraxılmadıqda da atoniyanın əmələ gəlməsinə şərait yaranır. Heyvanlarda atoniya zamanı mədə önlüklərinin mikroflorası dəyişir, işgənbədə çürümə prosesi artır, PH turşuluğa yönəlir və çoxlu miqdarda toksin toplanır. Eyni zamanda işgənbədə olan infizorların tərkibi dəyişir və ya məhv olurlar. Nəticədə mədə önlüklərində “B” qrupu vitaminlərin əmələ gəlməsi pozulur, orqanizmin baryer (qoruyucu) fəaliyyəti aşağı düşür və tədricən zəhərlənmə müşahidə olunur. Belə heyvanların işgənbəsi və digər mədə önlükləri həddən artıq bərk kütlə ilə dolu olur. Heyvanların iştahı olmamaqla, ümumi yorğunluq, arıqlama və kəskin olaraq süd məhsulunun azalması nəzərə çarpır. Xəstəliyin baş verməməsi üçün əsasən atoniyanı əmələ gətirən səbəbləri aradan qaldırmaq məsləhətdir.

**İşgənbənin iti timpaniyası.** İti timpaniya ən çox iri buynuzlu heyvanlarda və qoyunlarda baş verməklə işgənbədə sürətlə qaz əmələ gəlməsilə və onun köpməsilə xarakterizə olunur.

Xəstəliyin birinci dərəcəli səbəbi heyvanın tez qıcqıran yemlərlə yemləndirilməsidir. Bu baxımdan şirəli yemlərdən, cavan yaşıl ot, yonca və digər paxlalı bitkilər, yaşıl sütül qağıdalı şaxları, çuğundur və kələm yarpaqları çox təhlükəlidirlər. Xüsusən, həmin yemlər yaş olarsa, yağışdan sonra islanmışsa, şehlə örtülmüşsə, onda daha çox xəstəlik (iti köpmə) törətmək təhlükəsi artır. İti timpaniya əksər vaxtlarda heyvanlar göstərilən yemləri qəbul etdikdən sonra dərhal suvarılarsa baş verir.

Qeyd etmək lazımdır ki, yemlərin işgənbədə qıcqırması fizioloji bir haldır. Lakin həddən artıq işgənbəyə yaş keyfiyyətsiz yem kütləsi daxil olduqda həddən artıq qazların əmələ gəlməsi nəticəsində iti timpaniya baş verir. Adətən iti timpaniya zamanı digər mədə önlüklərinin atoniyası əmələ gəlir ki, mator fəaliyyəti pozulur. Bəzi hallarda işgənbə o qədər köpür ki, diafraqma və hətta işgənbənin özü partlayır.

İti timpaniya zonasıda təcili ciddi tədbir görülməlidir. İlk növbədə elə müalicə üsulu seçilməlidir ki, o işgənbədə qaz əmələ gəlməsinin qarşısı alınsın. Bu məqsədlə qusdurucu dərman vasitələrindən istifadə etməli və ya zonada qaz və işgənbədə olan möhtəviyatı boşaltmaq lazımdır.

İşgənbədə qaz əmələ gəlməsinin qarşısını almaq üçün daxilə 1litir 2%-li ixtiyol məhlulu, 1%-li farmalin məhlulu yeritmək lazımdır. Bundan əlavə 300 qram bitki yağına 3-5qram təmizlənmiş naftalan nefti və ya 1-2 l suya lizol qatıb daxilə vermək məsləhətdir. Yaxşı olar ki, daxilə 100qram ağ neft, 200 qram arax və 400qram suda qarışdırıb işgənbəyə yeridilsin. Daha səmərəli nəticə 20 ml valeriyan cövhərinə 20 ml ixtiyol və 500ml südü qarışdırıb daxilə yeritməkdə olur. İşgənbəyə şprislə 20 ml naşatır spirti vurduqda çox gözəl müalicəvi nəticə alınır.

Sonralar işgənbədə qaz əmələ gəlməsinin qarşısını almaq üçün daxilə 2-3 litr süd və ya1 litr suya 10-15 q süd turşusu qatıb işgənbəyə yeritmək lazımdır.

Heyvanlarda iti timpaniyanın qarşısını almaq üçün malabaxanları hökmən yemlərin xüsusiyyəti və yemləmə qaydaları ilə tanış etmək lazımdır. Onlar bilməlidirlər ki, tez qıcqıran yemlərdən

istifadə etməməli, bir yem rasionundan digərinə necə keçməli. Xüsusən quru yemləmədən, şirəli yemləməyə tədricən keçirilməlidir. Heyvanları şeh düşmüş və eləcə də yağışdan sonra çəmən otlaqlarında, yoncalıqda otarmaq olmaz. Yaşıl otlağa heyvanları bir qədər az şirəli və quru yemlərlə yemlədikdən sonra buraxmaq lazımdır. Bundan əlavə iti timpaniyanın qarşısını almaq üçün çalışmaq lazımdır ki, heyvanlar yaxşıca şirəli otla yemlədikdən sonra qətiyyən suvarılmamalıdır. Çünki, onda iti timpaniya kütləvi halda baş verə bilər. Timpaniyanın profilaktikası məqsədilə çalışmaq lazımdır ki, heyvanları isifadə olunan qarışıq qüvvəli yemləri, yonca otunu və yaşıl otları samanla qarışdırıb vermək lazımdır. Ümumiyyətlə, iti timpaniya zamanı ilk yardım üçün heyvandarları öyrətmək vacibdir. Onda heyvanlar arasında kütləvi təlafat olmur.

**Travmatiki retikulit və perikardit.** Travmatiki redikulit yad cisimciklərin (mismar, məftil, şüşə, dəmir qırığı və s.) torcuğun və ürək köynəyinin divarını zədələyərək iltihabı proses əmələ gətirməsi ilə bilinir. Ən çox bu xəstəlikləri yaşlı qaramalda, qoyun və keçilərdə müşahidə etmək olar. Hər iki xəstəlik iti və xroniki halda gedə bilir.

Xəstəliyin baş verməsinə əsas səbəb qaba yemlərin (ot, küləş, senaj, silos və s.) qüvvəli qarışıq yemlərin tərkibinə düşən metal və ya digər bərk cisimciklərdir. Ot və küləş tyuklər (bağlama) bu cəhətdən çox qorxuludur. Çünki bunlar məftillə bağlanır. Bəzən yad bərk cisimlər silos və senaja da düşə bilirlər. Heyvanlar bu xəstəliklərə metal tulantıları ilə zibillənmiş otlaqlarda otlayarkən də tutula bilirlər. Məlum olduğu kimi yem rasionunda fosfor duzları, natrium xlorid, karotin və mikroelementlər çatışmadıqda sağmal inəklər və cavan heyvanlarda yalama xəstəliyi baş verir. Yəni, qabaqlarına nə gəldi yeyir və yalayırlar. Belə ki, kül, torpaq yeyir, bərk cisimləri gəmirirlər və nəticədə bəzi yad iti cisimlər orqanizmə daxil olaraq onlarda travmatik retikulit və perikardit əmələ gətirirlər.

Qeyd etmək lazımdır ki, udulmuş bərk cisimlərin əksər hissəsi torcuqda, az hissəsi isə işgənbə və kitabçada qalırlar.

Küt və ya yuvarlaq bərk cisimlər ola bilsin ki, uzun müddət mədə önlüklərində qalaraq orqanizmə heç bir ziyan verməsin. Lakin ucu iti cisimlər torcuğun güclü sıxılması nəticəsində hərəkət edərək torcuğun selikli qişasını sonra isə divarını zədələyir. Sonrakı sıxılmalarla əlaqədar olaraq iti cisim torcuğun divarından keçərək diafraqmanı zədələyir və oradan da ürək köynəyini dəlib ürək əzələsinə daxil olur. Beləliklə də travmatiki prekardit əmələ gəlir.

Bəzən belə olur ki, torcuğu və ürək köynəyini zədələmiş iti bərk cisim yenidən çıxıb torcuğun boşluğuna düşür ki, belə halda heyvanın müvəqqəti olaraq vəziyyəti yüngülləşir. Sonralar isə yenidən ağırlaşır. Ümumiyyətlə, bərk yabanı cisimlər bu və ya digər orqanları zədələməklə onları infeksiya ilə çirkləndirir. Onlarda irinli-ixarozlu proses inkişaf etməyə başlayır. Bu proses nəticəsində əmələ gələn toksin orqanizmə təsir edir və heyvanın ümumi fizoloji vəziyyəti pisləşir. Ağrılı klinik əlamətlər müşahidə olunur. Mədə önlüklərinin mator və həzmedicilik fəaliyyəti pozulur. Nəticədə bütün həzm sistemində ciddi pozğuluqlar baş verir.

Travmatiki retikalit və perikardit zamanı xəstəliyin proqnozu qənaətbəxş deyildir. Əgər heyvan boğazdırsa onda onu müalicə edib, doğana qədər saxlamaq olar. Bu məqsədlə ilk növbədə heyvanı diyetik yeməyə keçirmək lazımdır. Yem rasionundan qaba və quvvəli yemləri çıxarmaq məsləhətdir.Heyvana istədiyi qədər su verməli və yem horrası ilə yemləndirilməli.Horraya dezinfeksiyaedici maddələr (2%-li ixtiyol, lizol və s.) əlavə etmək tövsiyə olunur. Eyni zamanda aclıq çuxurundan şprislə 500 min Bv pensilin yeritmək məsləhətdir.

Göstərilən xəstəliklərin profilaktikasında əsas şərt bundan ibarətdir ki, birinci növbədə heyvanları tam keyfiyyətli yemlərlə yemləmək, sonra qaba yemləri yad cisimlərdən, metal və məftil qırıntılarından təmizləmək, qarışaraq yemləri isə xüsusi elektromaqnit dəzgahından buraxmaq, sistematiki olaraq fermanın sahəsini məftil və digər metal qırıntılarından təmizləmək çox vacibdir.

Son vaxtlar bu xəstəliklərin verdiyi iqtisadi ziyanları nəzərə alaraq küləş və otların məftillə bağlanmağı ləğv olunmuş, sintetik iplə, kəndirlə bağlama üsuluna keçilmişdir. Bu üsulun da bəzi çatışmayan cəhətləri vardır. Belə ki, nəzarətsiz qalan bu cür sintetik iplər yemlə qarışıq heyvanlar tərəfindən qəbul edilir və onların mədə - bağırsaq sistemində keçilməməzlikləri əmələ gəlir odur ki, heyvandarlar diqqətli və səliqəli olmalıdırlar.

Ümumiyyətlə, iribuynuzlu heyvanların mədə önlükləri xəstəliklərnin vaxtında aşkar edilib, müalicə- profilaktikasını həyata kecirmək üçün heyvanların ildə iki dəfə ( yazda və payızda ) dispanserizasiya aparılması çox vacib baytarlıq tədbirlərindən biridir.

**Nəticə :**

1. İribuynuzlu heyvanlar arasında mədə önlükləri xəstəlikləri kifayət dərəcədə yayaılmışdır.
2. Qara –malın mədə önlükləri xəstəliklərindən qorumaq üçün yemlərin kəmiyyət və keyfiyyəti nəzərə alınmalıdır.
3. Müalicə və profilaktika məqsədilə iribuynuzlu heyvanlarda dispanserizasiya aparmaq məqsədə uyğundur.

**Болезни приджелудков крупного рогатого скота**

**А.Т.Мамедли, Ю.Т.Багиров, Р.Д.Мамедов**

В статье изложенные болезни преджелудуков крупного рогатого скота.

Из этих болезней очень широко распространены атония преджелудков, острая тимпания рубец, травматические ретикулит и перикардит, которые приносят большой урон животноводству. Учитывая опасность указанных болезней в статье рекомендованы лечение и борьба с этими болезнями.

***Ключевые слова:*** *лечение, профилактика, рублес, сетка, книжка.*

**Illnesses of large horned livestock**

**A.T.Mammadli Y.T. Bagirov R. C. Mammadov**

In article noncontagious Illnesses of large horned livestock are stated. From these Illnesses very widespread atonia proventriculus,sharp tympanites a hem,traumatic reticulit and pericardium which bring the big loss to animal industries. Considernig danger of the specified Illnesses in article treatment and struggle againist these Illnesses are recommended.

***Key words:*** *therapy, profhylactic, booklet, powder, diges tive system.*

